6. Greenspan, J.D., Slade, G.D., Bair, E., Dubner, R., Fillingim, R.B., Ohrbach, R. (2013). Pain sensitivity and autonomic factors associated with development of TMD: the OPPERA prospective cohort study. *J Pain*, № 14, p.63-74.
7. Alyasiry, A., Aljammali, Z.M., Almosawy, A.M., Alrubbaie, S. (2015). Dental health in osteoporotic women. *Res. J. Pharm Technol.,* № 8,1383 p.
8. Zakrzewska, J.M. (2004). Classification issues related to neuropathic trigeminal pain. *J Orofac Pain.*, № 18, p.325-31.
9. Scrivani, S.J., Keith, D.A., Kaban, L.B. (2008). Temporomandibular disorders. *N Engl. J Med.,* № 359, p.2693-705.
10. Weaver, C.M., Alexander, D.D., Boushey, C.J., Dawson-Hughes, B., Lappe, J.M., LeBoff, M.S., et al. (2016). Calcium plus vitamin D supplementation and risk of fractures: An updated meta-analysis from the National Osteoporosis Foundation. *Osteoporosis International.*, № 27, p.367-76.
11. Klemetti, E. (1996). A review of residual ridge resorption and bone density. *J Prosthet Dent.,* № 75, p.512-4.
12. Dijkgraaf, L.C., Bont, L.G., Boering, G., Liem, R.S. (1995). The structure, biochemistry, and metabolism of osteoarthritic cartilage: A review of the literature. *J Oral Maxillofac Surg.,* №53, p.1182-92.
13. Morel, M., Ruscitto, A., Pylawka, S., Reeve, G., Embree, M.C. (2019). Extracellular matrix turnover and inflammation in chemically-induced TMJ arthritis mouse models. *PLoS One.,* №14.
14. Al-Baghdadi, M., Durham, J., Araujo-Soares, V., Robalino, S., Errington, L., Steele, J. (2014). TMJ disc displacement without reduction management: A systematic review. *J Dent Res.,* № 93, p.37-51.

**Rəyçi: t.ü.f.d. Şəhla Yusubova**

Göndərildi: 15.08.2022 Qəbul edildi: 28.09.2022

## BİOLOGİYA ELMLƏRİ VƏ AQRAR ELMLƏR

## BIOLOGICAL AND AGRARIAN SCIENCES

DOI: https://doi.org/10.36719/2707-1146/25/22-28

**Tamara Salman qızı Abbasova**
AMEA Torpaqşünaslıq və Aqrokimya İnstitutu
aqrar elmlər üzrə fəlsəfə doktoru
abbasova.tamara.52@mail.ru

# RÜTUBƏTLİ SUBTROPİK ZONANIN (LƏNKƏRAN) SARI-QLEYLİ PSEVDOPODZOL TORPAĞINDA MAKROGÜBRƏLƏRİN FONUNDA LİMON BİTKİSİNİN MƏHSULDARLIĞINA MİKROELEMENTLƏRİN TƏSİRİ

**Xülasə**

Lənkəran rayonu İstisu qəsəbəsi "Sitrus vadisi" fermer təsərrüfatında aparılmış çöl təcrübələrində müəyyən edilmişdir ki, təcrübə sahəsinin torpaqları əsas qida maddələri olan azot, fosfor, kaliumun və mikroelementlərin (Cu, Zn) mənimsənilən formaları ilə zəif təmin olunmuşdur.

Mis və sink mikroelementləri limon bitkisi altına makrogübrələr fonunda 2 dozada tətbiq edilmişdir. $N_{200}P_{150}K_{200}$ fonunda məhsuldarlıq hektara 38.6 sentner olduğu halda misin 2.0 kq dozada verildiyi variantda məhsul artımı yüksəlmiş, 5.2 s/ha və ya 13.5 %, sinkin 2.0 kq verildiyi variantda isə bu uyğun olaraq 8.4 s/ha və ya 21.7 % olmuşdur.

***Açar sözlər:*** *makrogübrə, mikroelement, sarı-qleyli psevdopodzol torpaq, limon bitkisi, məhsuldarlıq*

**Tamara Salman Abbasova**

# Impact of mikroelements on the productivity of lemon plant against the background of makrofertilizers in the yellow-gleyey pseudopodzol soil of the humid subtropic zone (Lankaran)

**Abstract**

It was determined in the field experiments carried out in the "Citrus Valley" farm of Lankaran region, Istisu settlement, that the soils of the experimental area were poorly supplied with the absorbed forms of nitrogen, phosphorus, potassium and trace elements (Cu, Zn), which are the main nutrients. Copper and zinc microelements were applied under the lemon plant in 2 doses against the background of macrofertilizers. In the background of $N_{200}P_{150}K_{200}$, the productivity was 38.6 centners per hectare, but in the version where copper was given in a dose of 2.0 kg, the yield increased by 5.2 s/ha or 13.5%, and in the version where zinc was given in 2.0 kg, it was 8.4 s/ha or 21.7 %, respectively.

***Keywords:*** *makrofertilizer, microelement, yellow-gleyey pseudopodzol soil, lemon, productivity*

## Giriş

Sitrus bitkilərinin becərilməsi üçün ölkəmizin cənub bölgəsi olan Lənkəranda əlverişli torpaq-iqlim şəraiti mövcuddur. Sitrusçuluğun yüksək iqtisadi səmərəliliyə malik olması bu sahənin inkişaf etdirilməsini və daha da genişləndirilməsini zəruri edir. Azərbaycan

Respublikasında sitrus meyvəçiliyinin inkişafına dair 2018-2025-ci illər üçün hazırlanmış dövlət proqramında da bu sahənin inkişafına dövlət dəstəyinin gücləndirilməsi, sitrusçuluğun potensial imkanlarından istifadə etməklə sitrus meyvəçiliyinin istehsalının yüksəldilməsi haqqında qeyd edilmişdir.

Azərbaycanda sitrus bitkilərinin inkişafının, məhsuldarlığının və keyfiyyətinin yüksəldilməsi məqsədilə mütərəqqi aqrotexniki tədbirlərlə yanaşı rütubətli subtropik zonanın (Lənkəran) sarı qleyli psevdopodzol torpaqlarında mineral gübrələrdən (makro və mikrogübrələr) istifadə edilməsi ən aktual məsələlərdəndir. Mineral gübrələrdən istifadə etməklə bitkilər tərəfindən torpaqdan aparılmış qida maddələrinin miqdarı yenidən torpağa qaytarılmış olur, həmçinin torpaqda gilləşmənin qarşısı alınır, torpaq humusla, əsas qida elementləri ilə təmin olunur, onun dənəvərliyi yaxşılaşır, nəticədə torpağın münbitliyi bərpa olunmuş olur.

Sitrus meyvələri dünyada ən çox yetişdirilən meyvələr qrupuna daxildir. Bir çox vitaminlərlə zəngin olan sitrus meyvələrindən qida məhsulları kimi, qabığından, yarpaq və çiçəyindən alınan uçucu efir yağlarından isə ətriyyat istehsalında istifadə edilir.

Qeyd olunanları nəzərə alaraq cənub bölgəsində (Lənkəran) sitrus bağlarının sahəsinin genişləndirilməsi, sitrus meyvələrindən yüksək və keyfiyyətli məhsul almaq məqsədilə mikroelementlərin makrogübrələr fonunda limon bitkisinin məhsuldarlığına təsirinə aid elmi-tədqiqat işlərinin aparılması vacib məsələlərdəndir.

Bununla əlaqədar aparılması 2020-2024-cü illərdə nəzərdə tutulan tədqiqatlarda mis və sink mikroelementlərinin müxtəlif dozalarının makrogübrələr fonunda İstisu qəsəbəsi "Sitrus Vadisi" fermer təsərrüfatının sarı qleyli psevdopodzol torpaqlarında limon bitkisinin inkişafına, məhsuldarlığına və bitkinin meyvəsinin keyfiyyət göstəricilərinə təsirinin öyrənilməsi qarşıya məqsəd qoyulmuşdur.

Sitrus bitkilərindən olan limon (citrus, lomon B) həmişəyaşıl, çoxillik ağac bitkisidir, hündürlüyü 1.0-2.0 m-dir. Onun purpur rəngdə olan çiçəkləri birevli olub, çox ətirlidir, yarpaqları lansetşəkillidir, aralarında tikanlar mövcuddur. Meyvələri qızılı-sarı rəngdə olub, əsasən oktyabrın axırı və noyabrda yetişir. 8-12 dilimdən ibarət olan limon meyvəsinin tərkibində üzvi turşu, şəkər, "C" vitamini və pektin maddələri mövcuddur. İqlim şəraitindən asılı olaraq uzun müddət məhsul vermə qabiliyyətinə malikdir. Limon digər sitrus bitkilərindən fərqli olaraq nisbətən soyuğadavamlıdır. Onun vətəni Hindistandır. Çində bu bitkini "limunq" adlandırırlar, tərcümədə "analar üçün xeyirli" deməkdir. Limonun qoxusu insanı şadlandırır, qabığı və toxumları ürəyə faydalıdır, şirəsi isə susuzluğu yatırır. Limon qabığından alınan yağdan ən çox ətriyyat sənayesində istifadə edilir. Təbabətdə isə limon yağı dərmanların tərkibində xoş ətirli maddə kimi istifadə edilir. Limon çox qüvvətli bakterosid təsirə malikdir. O, angina və avitaminoz xəstəliklərinə qarşı ən effektiv vasitədir. Limon şirəsi virus xəstəlikləri (korona, xərçəng virusları) ilə mübarizədə istifadə edilir. Orqanizmin immunitetini artıran limon, qaraciyərdə əmələ gələn çürümə prosesinə qarşı istifadə edilən ən güclü tədbirlərdəndir (Vorontsov, Shteyman, 982:119, 126).

Rütubətli subtropiklərin torpaqları, dənizsahili ovalığı və Lənkəran vilayətinin alçaq dağlıq qurşağını, dəniz səviyyəsindən 600-700 m-dən 25 m-ə qədər olan yüksəklikləri tutur və Respublikanın ən kənar cənub hissələrinə qədər yayılır.

Yüksək atmosfer rütubətlənməsi, mövsümü düşən yağıntılar (maksimum payız və minimum yay aylarında) yüksək istilik və yüksək səviyyəli aktiv temperatur, uzun, isti qış bütün bu göstəricilər Lənkəran rayonunun rütubətli subtropik iqlimini, Aralıq dənizinə xas olan iqlim xüsusiyyətlərinə bənzədir. Orta illik temperatur 14-14.3$^0$ C-dir. Ən soyuq ayın (yanvar) temperaturu 3.7-4.3$^0$ C arasında tərəddüd edir. Ən isti ayın (iyul) orta temperaturu 24.5-25.6$^0$ C-dir. Torpaqlar il boyu donmur. 10$^0$ C-dən yuxarı fəal temperaturların illik cəmi 3800-4400$^0$ C-dir. Orta illik yağıntı 1400-1700 mm-dir.

Təbii bitki örtüyü Hirkan tipli suptropik meşə bitkiləri ilə səciyyələnir. Bunlar əsas etibarı ilə dəmirağac, şabalıdyarpaq palıd, azat ağacından ibarətdir. Rütubətli və yarımrütubətli zonanın ərazisi kənd təsərrüfatı nöqteyi nəzərindən çox yaxşı mənimsənilmişdir. Ərazidə əsasən

suvarma əkinçiliyi inkişaf etmişdir. Tərəvəz-bostan bitkiləri və sitruslar (limon, mandarin, feyxoa, portağal, kivi) geniş inkişaf tapmışdır (Babayev, 2006:40, 154).

Lənkəran ərazisində torpaq tədqiqatlarının geniş miqyasda aparılmasına baxmayaraq mikroelementlərin bu zonanın torpaqlarında yayılması, miqdarı, kənd təsərrüfatı bitkilərinin məhsuldarlığı və keyfiyyətinə təsiri bir qədər zəif öyrənilmişdir. Xüsusən də mis elementi demək olar ki, heç öyrənilməmişdir. Mis mikroelementi biofil element olduğu üçün onun sitrus bitkiləri altında tətbiqinin öyrənilməsi məqsədə uyğundur. A.B.Axundovanın Lənkəran subtropik vilayətinin torpaq, bitki və sularında bir sıra mikroelementlərin yayılmasının biokimyəvi əsasları (1980-1988 və 2000-2002-ci illər), E.H.Nəsirovun Lənkərançay hövzəsində mikroelementlərin torpaqda yayılması və ekoloji qiymətləndirilməsi kimi tədqiqatlarını (2010-2012-ci illər) xüsusilə qeyd etmək lazımdır (Axundova, 1996; Axundova, 2002:159; Axundova 2012:35; Axundova, 2012: 12; Nəsirov, 2012).

Mis mikroelementinin torpaqlarda yayılması və miqrasiyası torpaqların xassəsindən asılı olaraq fərqlənir. Belə ki, onun mütəhərrikliyi turş torpaqlarda karbonatlı torpaqlara nisbətən daha yüksəkdir. Misin torpaqda olan miqdarı əsasən humusun miqdarından asılıdır. Torpağın turşuluğu ilə misin mütəhərrikliyi arasında əlaqə Ş.N.Güləhmədov, A.İ.Bayeva, B.Q.Şəkuri, Ə.B.Axundova və digərlərinin tədqiqatlarında öz əksini tapmışdır. Mis mikroelementi bir çox fermentlərin tərkibinə daxil olmaqla bitkilərin həyatında mühüm rol oynayır. Orqanizmdə bu elementin çatışmaması zamanı tənəffüs, fotosintez, karbohidrat mübadiləsi kimi bir çox fizioloji proseslərin gedişi pozulur. O, bitkinin su balansını təmin etdiyindən onun çatışmazlığı bitki hüceyrəsində turqor vəziyyətinin zəifləməsinə səbəb olur və nəticədə torpaqda suyun miqdarının kifayət qədər olmasına baxmayaraq yarpaqların solmasına səbəb olur. Məlumdur ki, mikroelementlər torpağın münbitliyinin yüksəlməsinə səbəb olmaqla yanaşı, torpaqda makroelementlərin bitkilər tərəfindən mənimsənilməsinə də müsbət təsir göstərir. Mis mikrogübrəsinin tətbiqi nəticəsində onun və makrogübrələrin bitki tərəfindən mənimsənilməsi 2-4 dəfə artmış olur. Mis mikroelementi bitkinin soyuğa, quraqlığa və istiyə davamlılığını artırır. Onun çatışmaması nəticəsində bitkinin boyu inkişafdan qalır, xloroz xəstəliyi əmələ gəlir, çiçəkləmə ləngiyir, yarpaqların ucları ağarır və nəticədə məhsuldarlıq azalır.

Sink mikroelementi isə bütün bitki orqanizmlərinin tərkibinə daxil olub, bəzən faizin on min, min, bəzən də yüzdə bir hissəssinin təşkil edir. Sinkin bitkidə olan miqdarı həm bitkinin bioloji xüsusiyyətlərindən, həm də torpaqda olan mütəhərrik formasının miqdarından asılı olaraq dəyişir. Yağıntıların miqdarının çox olduğu illərdə sinkin miqdarı yüksək olur, nəinki yağıntıların miqdarının az, temperaturun isə yüksək olduğu illərdə. Müəyyən edilmişdir ki, bu element, bitki və ümumiyyətlə bütün canlı orqanizmlərdə gedən oksidləşmə-reduksiya proseslərinin idarə olunmasında çox mühüm rol oynayır. O, bir çox fermentlərin tərkib hissəsidir. Sink mikroelementi də bitkilərdə xlorofilin sintezində iştirak edərək fotosintez və karbon mübadiləsinin gedişinə mühüm təsir edir. Bitkilərin bu elementlə normal qidalanması fotosintez prosesinin yüksəlməsinə, elementin çatışmaması isə xlorofilin miqdarının azalmasına səbəb olur. Müəyyən edilmişdir ki, sink rüşeymin mayalanması və inkişafında mühüm rol oynayır. Odur ki, sinklə qidalanmanın, bitkinin çiçəklənmə dövründə aparılması daha məqsədə uyğundur. Bir çox müəlliflər tərəfindən aparılmış tədqiqatlarda müəyyən edilmişdir ki, bitki altında makrogübrələr fonunda mikroelementlərin tətbiq edilməsi, torpaqda gedən biokimyəvi proseslərə təsir edərək bitki orqanizmində oksidləşmə-reduksiya reaksiyalarının gedişini sürətləndirir, bitkilər tərəfindən makroelementlərin mənimsənilməsi daha da artır. Müəyyən olunmuşdur ki, sink də mis mikroelementi kimi bitkinin istiyə və şaxtaya davamlılığının yüksəldilməsinə səbəb olur.

Bu mikroelement torpaqda çatışmadıqda qeyri üzvü fosfatların bitkinin üzvü birləşmələrinə çevrilməsi prosesi ləngiyir. Mikroelementin bitki altına tətbiqi nəticəsində bitki tərəfindən fosforun mənimsənilməsi qaydaya düşür. Beləliklə aparılan tədqiqatlardan aydın olur ki, mikroelementlərin təsirindən bitkilərin məhsuldarlığı yüksəlir, onların şaxtaya, quraqlığa, istiyə, torpağın duzluluğuna, ziyanvericilərə və bir çox xəstəliklərə qarşı davamlılığı artır

(Gyulakhmadov, 1986:6).

## Tədqiqatın obyekti və metodikası

Çöl tədqiqatları Lənkəranın İstisu qəsəbəsində yerləşən "Sitrus Vadisi" fermer təsərrüfatının sarı qleyli psevdopodzol torpaqlarında qoyulmuşdur. Tədqiqat obyekti olaraq sitrus bitkilərindən olan limon (citrus limon B) götürülmüşdür. Limon həmişəyaşıl, çoxillik ağac bitkisidir, hündürlüyü 1,5 m - 2,0 m-dir. Yarpaqları lansetşəkilli olub aralarında tikanlar mövcuddur. Onun purpur rəngdə olan çiçəkləri birevli olub, çox ətirlidir. Meyvələri qızılı sarı rəngdədir, əsasən oktyabrın axırı, noyabrda yetişir. Limon digər sitrus bitkilərindən fərqli olaraq nisbətən soyuğadavamlıdır. İqlim şəraitindən asılı olaraq uzun müddət məhsulvermə qabiliyyətinə malikdir. Təcrübə sahəsində bitkinin qida sahəsi 3x5=15m$^2$-dir.

Gübrələri elmi əsaslar üzrə tətbiq etmək məqsədilə, çöl təcrübələri qoymazdan əvvəl təcrübə sahəsinin torpaqlarını aqrokimyəvi cəhətdən məqsədilə 0-20; 20-40; 40-60; 60-80; 80-100 sm dərinlikdə qatlardan torpaq nümunələri götürülmüş və bu nümunələrdə humusun, pH-su və duz suspenziyasında, əsas qida elementləri (azot, fosfor, kalium) və mikroelementlərin (Cu və Zn) ümumi və mənimsənilən formaları təyin edilmişdir. Təhlillər Azərbaycan Milli Elmlər Akademiyası Torpaqşünaslıq və Aqrokimya İnstitutunda, Geologiya və Geofizika İnstitutunun "Analitik Mərkəz"ində aparılmışdır.

Çöl təcrübələri limon bitkisi ilə 2020-2022-ci illərdə, 5 variantda, 3 təkrarda, aşağıdakı sxem üzrə qoyulmuşdur.

N200P150K200 (fon)
Fon + Cu 1.0 kq/ha
Fon + Cu 2.0 kq/ha
Fon + Zn 1.0 kq/ha
Fon + Zn 2.0 kq/ha

Təcrübə sahəsinə vermək üçün azot N (21% t.e.m.h.) ammonium sulfat, fosfor $P_2O_5$ (17 % N, 30 % $P_2O_5$ və 26 % $K_2O$ t.e.m.h.) nitrofoska, kalium $K_2O$ (46%-kalium, 13.8 % azot t.e.m.h.) kalium nitrat gübrələrindən istifadə edilmişdir. Mikroelementlər: mis-Cu (25.9 %, t.e.m.h.) $CuSO_4$, sink-Zn (22.8 % t.e.m.h.) isə $ZnSO_4$ duzları şəklində tətbiq edilmişdir. Nitrofoska bitki altına damcı üsulu ilə fevralda, ammonium sulfat mikroelementlərlə (Cu, Zn) birlikdə may-iyun aylarında, kalium nitrat isə meyvənin böyümə mərhələsində, avqust ayında verilmişdir (Mövsümov, 1996:12, 81).

Fermer təsərrüfatında mineral gübrələr suvarma zamanı damcı üsulu ilə bitkinin kök sisteminin yerləşdiyi torpaq zonasına təcrid olunmuş şəkildə verilir. Odur ki, sızılma, səthdən suyun və mineral gübrələrin kənara axıdılması itkilərinə yol verilmir, cərgə araları suvarılmır, nəticədə suvarma suyuna və mineral gübrələrə qənaət edilmiş olur (Talıbov, 2014:62).

## Təhlil və müzakirələr

Təcrübə sahəsinin sarı qleyli psevdopodzol torpaqlarının mühiti turşdur. Duz məhlulunda pH 4.7-5.0 arasında dəyişir. Sarı qleyli psevdopodzol torpaqlarda humusun miqdarı əkin qatında 1.0-2.5 %-ə qədər çatır. Səciyyəvi cəhətlərdən biri odur ki, humusun miqdarı aşağı qatlara doğru getdikcə tədricən azalır. Əsas qida maddələrindən olan azotun mənimsənilən formasının miqdarı 24.1-40 mq/kq, fosforunki 88.0-129.0 mq/kq, kaliumun miqdarı isə 129.0-159.9 mq/kq arasında tərəddüd edir. Mikroelementlərdən: mütəhərrik formada olan misin miqdarı torpaq profili üzrə 1.2-2.2 mq/kq arasında dəyişir. Üst qatlarda misin miqdarı (0-20; 20-40 sm) 2.2-2.0 mq/kq, aşağı qatlarda isə (40-60; 60-80; 80-100 sm) bu azalmış, uyğun olaraq 1.70; 1.40; və 1.2 mq/kq olmuşdur. Sinkin miqdarı isə üst qatlarda (0-20; 20-40 sm) 2.0-1.8 mq/kq, alt qatlarda isə (40-60; 60-80; 80-100 sm) azalmış - 1.5; 1.35; 1.15 mq/kq olmuşdur. Aparılmış torpaq təhlillərindən aydın olmuşdur ki, təcrübə sahəsinin torpaqları azot, fosfor, kalium və mikroelementlərin asan mənimsənilən miqdarı ilə az təmin olunmuş torpaqlardır (Güləhmədov, Axundov, 1980:10).

Bir çox kənd təsərrüfatı bitkiləri üzərində aparılmış tədqiqatlar nəticəsində müəyyən

olunmuşdur ki, torpaqda azot, fosfor, kalium və mikroelementlərin (Cu, Zn) mənimsənilən formalarının miqdarı azdırsa, bu torpaqlara mineral gübrələri tətbiq etmədən yüksək məhsul əldə etmək mümkün deyildir. Müəyyən edilmişdir ki, torpağa yüksək dərəcədə aqrotexniki qulluq olarsa, həmçinin normal suvarma aparılsa belə, gübrə tətbiq etmədən yüksək məhsul əldə etmək qeyri mümkündür.

**Cədvəl 1.**
**Lənkəran rayonu "Sitrus vadisi" fermer təsərrüfatının sarı-qleyli psevdopodzol torpaqlarının aqrokimyəvi səciyyəsi (2020-ci il)**

| № | Dərinlik, sm-lə | Humus, %-lə | pH | | Azot | | Fosfor | | Kalium | | Mikroelementlər | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | | | | | | | | Cu | | Zn | |
| | | | Suda | Duz məhlulunda | Ümumi , %-lə | Mənimsənilən mq/kq | Ümumi, %-lə | Mənimsənilən, mq/kq | Ümumi, %-lə | Mənimsənilən mq/kq | Ümumi | Mütəhərrik, mq/kq | Ümumi | Mütəhərrik, mq/kq |
| 1 | 0-20 | 2,5 | 5.7 | 5,0 | 0,14 | 40.0 | 0.30 | 129.0 | 2.0 | 159.9 | 29.2 | 2.2 | 28.0 | 2.0 |
| 2 | 20-40 | 2.0 | 5.5 | 5.0 | 0.12 | 36.3 | 0.28 | 120.6 | 2.15 | 151.2 | 27.5 | 2.0 | 26.5 | 1.8 |
| 3 | 40-60 | 1.0 | 5.6 | 4.9 | 0.09 | 29.9 | 0.27 | 109.9 | 2.18 | 140.5 | 26.1 | 1.7 | 25.0 | 1.5 |
| 4 | 60-80 | 1.3 | 5.5 | 4.8 | 0.06 | 26.2 | 0.24 | 98.5 | 2.22 | 135.0 | 23.2 | 1.4 | 23.2 | 1.35 |
| 5 | 80-100 | 1.0 | 5.8 | 4.7 | 0.04 | 24.1 | 0.20 | 88.0 | 2.30 | 129.4 | 20.8 | 1.2 | 20.8 | 1.15 |

Tədqiqat işinin 2020-2022-ci il mərhələsində limon bitkisinin məhsuldarlığına makrogübrələr fonunda mikrogübrələlrin təsirini öyrənilməsi məqsədilə çöl təcrübələri qoyulmuşdur. Bitkinin məhsulu hər bir variantda təkrarlar üzrə yığılmış, ayrı- ayrılıqda çəkilərək hesablanmışdır. 2 saylı cədvəldən göründüyü kimi NPK-nın tətbiq edildiyi variantda limon bitkisinin məhsuldarlığı 38.6 s/ha olmuşdur. Çöl təcrübələrində makrogübrə fonunda ($N_{200}P_{150}K_{200}$) sink və mis mikroelementləri limon bitkisi altına 2 dozada tətbiq edilmişdir. Mis mikroelementinin hektara 1.0 kq tətbiq edildiyi variantda məhsuldarlıq 42.5 sentner olduğu halda, 2.0 kq verildiyi variantda isə bu 43.8 sentner olmuşdur. Makrogübrələr fonunda misin hektara 1.0 kq verildiyi variantda məhsul artımı burada 3.9 sentner və ya 10.1 %, misin hektara 2.0 kq verildiyi variantda isə artım 5.2 sentner və ya 13.5 % olmuşdur. Sink mikroelementinin verildiyi variantlarda bu uyğun olaraq 45.6 sentner və 47.0 sentnerdir. NPK verildiyi variantla müqayisədə məhsul artımı sinkin hektara 1.0 kq verildiyi variantda 7.0 sentner və ya 18.1 %, 2.0 kq verildiyi variantda isə 8.4 sentner və ya 21.7 % təşkil edir. 2 saylı cədvəldən göründüyü kimi ən yüksək məhsuldarlıq NPK fonunda, misin və sinkin hər birinin hektara 2.0 kq dozada verildiyi variantlarda alınmışdır (12).

**Cədvəl 2.**
**Mikroelementlərin (Cu, Zn) müxtəlif dozalarının mikrogübrələr fonunda limon bitkisinin məhsuldarlığına təsiri. (2020-2022-ci illər)**

| № | Variantlar (kq/ha, t.e.m.h.) | Məhsuldarlıq illər üzrə | | | Orta məhsuldarlıq s/ha | Artım | |
|---|---|---|---|---|---|---|---|
| | | 2020-ci il, s/ha | 2021-ci il, s/ha | 2022-ci il, s/ha | | s/ha | %-lə |
| 1. | $N_{200}P_{150}K_{200}$ (fon) | 32.6 | 46.5 | 36.8 | 38.6 | - | - |
| 2. | Fon + Cu1.0kq/ha | 35.9 | 51.7 | 39.9 | 42.5 | 3.9 | 10.1 |
| 3. | Fon + Cu2.0kq/ha | 37.2 | 53.0 | 41.2 | 43.8 | 5.2 | 13.5 |
| 4. | Fon + Zn1.0kq/ha | 39.5 | 54.0 | 43.2 | 45.6 | 7.0 | 18.1 |
| 5. | Fon + Zn2.0kq/ha | 41.0 | 55.1 | 45.0 | 47.0 | 8.4 | 21.7 |

Burada məhsul artımı uyğun olaraq misdə 5.2 s/ha və ya 13.5 %; sinkdə isə bu 8.4 s/ha və ya 21.7 % olmuşdur.

## Nəticə

1. Beləliklə Lənkəranın İstisu qəsəbəsində yerləşən "Sitrus vadisi" fermer təsərrüfatının sarı-qleyli psevdopodzol torpaqlarında aparılan təhlillərdən aydın olmuşdur ki, təcrübə sahəsinin torpaqları azot, fosfor, kalium və mikroelementlərin asan mənimsənilən miqdarı ilə az təmin olunmuş torpaqlardır.

2. Çöl təcrübələrində mis və sink mikroelementləri limon bitkisi altına NPK fonunda iki dozada tətbiq olunmuşdur. Alınmış rəqəmlərin təhlili göstərir ki, ən yüksək məhsul artımı $N_{200}P_{150}K_{200}$ fonunda limon bitkisi altına sinkin hektara 2.0 kq dozada verildiyi variantda alınmışdır. Yəni bu uyğun olaraq 8.4 sentner və ya 21.7 % təşkil edir.

## Ədəbiyyat

1. Vorontsov, V., Shteyman, U. (1982). Vozdelivanie subtropitcheskikh kultur. Moskva: Kolos, 119 s.
2. Babayev, M., Cəfərova, Ç., Həsənov, V. (2006). Azərbaycan torpaqlarının müasir təsnifatı, Bakı: Elm, 40, 154 s.
3. Axundova, Ə., Eyyubova, S., Teymurova, T. (2002). Uzun müddət və müntəzəm gübrələnmiş çay plantasiyası torpaqlarında mütəhərrik manqan. Bakı: Az.Resp. torpaq islahatlarının elmi təminatı resp. I konf. mater., Elm,159 s.
4. Axundova, Ə. (1996). Mikroelementlərin çay bitkisinin məhsuldarlığına və keyfiyyətinə təsiri. Bakı: Azərbaycan aqrar elmi, № 3-4.
5. Axundova, A. (2012). Mikroelementlərin Lənkəran subtropik vilayətinin sarı-qleyli (lixisos) torpaqlarında yayılması. Bakı: M.R.Abduyevin 85 illiyinə həsr edilmiş beynəlxalq konfransın materialları, 127 s.
6. Axundova, A. (2012). Nekotoryi podxody k ekologitcheskoy otsenke pochv basseyna reki Lenkoranchay (Azerbaydzhan), Tbilisi: Izvestiya Aqrarnoy nauki, № 2, 35 s.
7. Nəsirov, E.H. (2012). "Lənkərançay hövzəsi torpaqlarında mikroelementlərin biogeokimyəvi yayılma qanunauyğunluqları və torpaqların ekoloji qiymətləndirilməsi". Biolog.üzrə f.d. elim dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiya işinın avtoreferatı, Bakı.
8. Gyulakhmadov, A. (1986). Mikroelementi v pochvakh, rasteniya i ikh primenenie v rastenievodchestvo, Baku: Elm, 6 s.
9. Mövsümov, Z. (1996). Aqrokimyaya dair qısa məlumat kitabı, Bakı: Elm.

10. Talıbov, İ. (2014). Damcılarla suvarma texnikası vasitəsilə makro və mikroelementlərin armud bağlarına tətbiqi texnologiyası, Bakı: Avropa, 63 s.
11. Güləhmədov, Ə., Axundov, F. (1980). Mineral gübrələrin və mikroelementlərin kənd təsərrüfatında səmərəli tətbiqi üçün torpaqların qida maddələri ilə təmin olunmasını göstərən qradasiya, Bakı, 10 s.
12. https://issuu.com/cografiyakitablari/docs/torpaqsunasliq

Göndərildi: 19.08.2022 Qəbul edildi: 30.09.2022

DOI: https://doi.org/10.36719/2707-1146/25/29-34

**Akifə Çingiz qızı Xəlilova**
"Aqromexanika" Elmi-Tədqiqat İnstitutu
xelilovaakife95@gmail.com
**Vüsalə Famil qızı Rüstəmova**
"Aqromexanika" Elmi-Tədqiqat İnstitutu
vusala.rustamova28@mail.ru

# QRENANIN İNKUBATOR ŞƏRAİTİNDƏ YENİ TEXNOLOGİYA VASİTƏSİLƏ OYADILMASININ TƏHLİLİ

**Xülasə**

Tədqiqat obyekti olaraq "Aqromexanika" Elmi-Tədqiqat İnstitutunda hazırlanmış və sınaqdan keçirilmiş kəndli-fermer təsərrüfatlarında "Tut ipəkqurdu yumurtasını (qrena) oyadan qurğu"dur.

İşin məqsədi kəndli-fermer təsərrüfatlarında "Tut ipəkqurdu yumurtasını (qrena) oyadan qurğu"sunun elmi cəhətdən əsaslandırılması və işlənməsidir.

Qoyulmuş məqsədə nail olmaq üçün kəndli-fermer təsərrüfatlarında ipəkqurdu yumurtasını oyadan qurğunun istifadəsi, onların quruluşu, texniki göstəriciləri və s. məsələlərinin öyrənilməsi və təhlil olunmasıdır.

Yüksək barama məhsulu əldə etmək üçün inkubasiya başlanğıcını düzgün təyin etmək lazımdır. Bu ona görə vacibdir ki, müxtəlif yaşdakı ipəkqurdu tırtılları fərqli tut yarpaqları ilə qidalanmalıdırlar. İpəkqurdu tırtıllarını qidalandırmaq üçün ən yaxşı vaxt tutdakı ilk iki yarpağın görünüşü ilə üst-üstə düşməsidir. İnkubasiyanın başlama vaxtı birbaşa tutda yarpaqların açılmasından asılıdır və hər bir təbii zona üçün fərqlidir. Bu amilə xüsusi fikir vermək lazımdır.

***Açar sözlər:*** *barama, ipək, ipəkqurdu, inkubasiya, qrena, incubator*

**Akifa Chingiz Khalilova**
**Vusala Famil Rustamova**

## Analysis of grana in incubator awakening through the new technology

**Abstract**

The object of research is the "Device for awakening mulberry silkworm eggs (grena)" developed and tested at the "Agromechanics" Scientific-Research Institute in peasant farms.

The purpose of the work is the scientific justification and development of the "device that awakens mulberry silkworm eggs (grena)" in peasant-farmers.

In order to achieve the set goal, the use of the silkworm egg hatching device in peasant farms, their structure, technical indicators, etc. is the study and analysis of issues.

In order to obtain a high cocoon yield, it is necessary to correctly determine the start of incubation. This is important because silkworm larvae of different ages should be fed different mulberry leaves. The best time to feed silkworm caterpillars coincides with the appearance of the first two leaves on the mulberry. The time of the start of incubation depends directly on the

opening of the leaves on the mulberry and is different for each natural zone. Special attention should be paid to this factor.
***Keywords:*** *cocoon, silk, silkworm, incubation, grena, incubator*

## Giriş

Azərbaycanda baramaçılığın tarixi çox uzaq keçmişə – V əsrə gedib çıxır. XII əsrdən isə Azərbaycan ipəyi Böyük İpək Yolu ilə Avropa və Asiya ölkələrinə ixrac olunmağa başlanılmışdı.

Tədqiqatçıların bildirdiklərinə görə, XI əsrin 70-ci illərində Şamaxı şəhərində olmuş İtaliya səyyahı Kontarini yazırdı ki, bu şəhərdə yüksək keyfiyyətli ipək parçalar hazırlanır. Həmin dövrlərdə Şamaxıdan Rusiyaya, İraqa, Suriyaya və başqa ölkələrə ipək aparılırdı (Abbasov, 2017:1).

Azərbaycanda qeyri-neft sektorunun inkişaf etdirilməsi ilə bağlı həyata keçirilən tədbirlər çərçivəsində qədim ənənələrə söykənən baramaçılığın və ipəkçiliyin bərpası kənd təsərrüfatının prioritet istiqamətlərindən biri kimi müəyyən edilmişdir (2).

2014-cü ildə neft erasının bitdiyini elan edən cənab İlham Əliyevin qeyri-neft sektorunda diqqət ayırdığı əsas sahələrdən biri də ipəkçilikdir. Onun 2016-cı il 6 dekabr tarixli Fərmanı ilə təsdiqlənən “Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi”ndə aqrar sektorun davamlı və rəqabətqabiliyyətli inkişafı dövlətin iqtisadi siyasətinin prioritet istiqamətlərindən biri kimi müəyyən edilmişdir. Prezidentin bu Fərmanından sonra ölkəmizdə ipəkçiliyin də yenidən inkişafı üçün ciddi addımlar atıldı.

Kənd Təsərrüfatı Nazirliyi bu məqsədlə hibrid ipəkqurdu sənaye toxumlarını kümdarlara pulsuz paylayır. 2020-ci ildə Nazirlik Azərbaycanın 40 rayonundan olan 6 min kümdara 20 min qutu hibrid ipəkqurdu paylayıb. Onlardan 5 min qutu (146 kq) Qax Damazlıq İpəkçilik Stansiyasında yetişdirilib. Hesablamalara görə, 300-400 kq yaş barama üçün fermerlər 2700-dən 3600 manata (kilosu 9 manatdan) qədər vəsait əldə edə bilərlər. Bu vəsaitlərin 4 manatını "Azəripək" MMC, 5 manatını isə dövlət subsidiya şəklində kümdarlara ödəyir (3).

İpəkçiliyin yem bazasını təşkil etmək üçün son 3 ildə Çindən gətirilmiş 3,5 mln. tut tingi rayonlarda əkilib. Dövlət Proqramında Azərbaycanda 2025-ci ilə qədər ölkədə yaş barama istehsalını illik 6 min tona çatdırmaq planlaşdırılır (Şəkil 1).




**Şəkil 1. Respublikada 2017-2025-ci illərdə yaş barama istehsalı**

İpəkqurdu, beş min ildir insanlar tərəfindən həyata keçirilən süni seçim obyekti olduğundan, bəzi xüsusiyyətlərinə görə digər böcəklərdən fərqlənir. Nəticədə, ipəkqurdu insandan tamamilə asılı vəziyyətə gəldi və yalnız onun qayğısı sayəsində mövcud ola bilər (Abbasov, 2009:277,56).

Sənayedə ipəkqurdunun yetişdirilməsi, ipəkqurdu barama istehsalını təmin edən mürəkkəb kompleks məcmusu kimi başa düşülür. İpəkçilikdə aşağıdakı mərhələlər ayırd edilə bilər:

– tut yetişdirmə, yəni fidan və yem tut əkilməsi;
– grenanın inkubasiyası - ipək qurdu yumurtalarının canlandırılması;
– qurd bəsləmək - ipəkqurdu tırtıllarını bəsləmək;
– ipəkqurdunun yeni perspektivli cinslərinin çoxalması;
– qrena istehsalı; baramanın ilkin emalı (Sergeevich, 2005:266,109).

Kəndli-fermer təsərrüfatlarında keyfiyyətli, bol barama məhsulu əldə etmək üçün, tut ipəkqurdu yumurtasının (qrenanın) əldə edilməsi və onun oyadılması əməliyyatı aparılır. Qeyd olunmalıdır ki, "Tut ipəkqurdu yumurtasının (qrena) inkubasiya qurğusu" "Aqromexanika" ETİ-da, eləcə də, Respublikamızda işlənilən ilk elmi-tədqiqat işidir. "Tut ipəkqurdu yumurtasının (qrena) inkubasiya qurğusu"na qoyulan tələbləri nəzərə alaraq, onun iş prinsipinin realizə edilməsi üsulunu elmi hipotezasını irəli sürəcək texniki vasitənin texnoloji struktur sxemi işlənilmişdir. "Tut ipəkqurdu yumurtasının (qrena) oyadılması qurğusu"nun struktur sxemi, yəni qrenanın inkubasiyası aqrozootexniki bir tədbir olmaqla yüksək keyfiyyətli və bol barama məhsulu almağın əsasını təşkil edir.

Tut ipəkqurdu tam inkişaf dövrünü 4 mərhələdə - qrena, tırtıl, pup və kəpənək mərhələlərində başa çatdırır (Seyidov, Abbasov, 2012:86,19). Digər yumurtalarda olduğu kimi qrenada da zamanla tırtıl halına çevrilən kiçik canlı embrion var. Tırtılların inkişafı üçün qida, istilik və tənəffüs üçün hava tələb olunur. Embrion tırtıl halına çevrilməsi üçün bütün lazım olan şərait inkubistlər tərəfindən yaradılmalıdır. Qrenanın (toxumu) inkubasiyası toxumun oyadılması deməkdir. Adətən estivasiya, yəni qışlama dövrü başa çatdıqdan sonra (çəkil ağacında 5-7 yarpaq əmələ gələndə) tut ipəkqurdu toxumu dirilməyə qoyulur (Zlotin, 1984:72,24).

Qrenanın inkubasiyası yumurta embrionunun əlverişli xarici şərtlərin təsirləri nəticəsində inkişafı prosesini əhatə edir. Xarici şərtlərlə əlaqəli amillərdən ipəkqurdu istehsalçıları praktiki olaraq yalnız üçünü nəzərə alır: istilik, rütubət, havalandırma (Zlotin, 1986:32,12).

Beləliklə, inkubasiyanın başlanması üçün əsas şərt istilikdir. İstilik mənbəyinin mənşəyindən asılı olaraq inkubasiya prosesi 2 cür olur:

1. Təbii inkubasiya;
2. Süni inkubasiya.

*Təbii inkubasiya* metodu ipəkqurdu embrionunun yazda havanın istiliyinin təbii olaraq yüksəldiyi zaman inkişaf etməsidir. Təbii inkubasiya ilə yumurtalardan çıxan tırtıllar qrenanın süni inkubasiyasında olduğu kimi barama məhsulu verə bilir. Tamamilə havadan asılı olan inkubasiya ilə tırtılların yumurtadan çıxması həmişəkindən gec baş verir və bir neçə gün təxirə salınır.

*Süni inkubasiyada* əlverişli şərait xüsusi otaqlarda (inkubatoriyada) və ya inkubatorda (oyadıcı şkaflarda) süni yaradılır.

Süni inkubasiya əhəmiyyətli üstünlüklərə malikdir yəni, qrenanın inkişafı prosesinin hava şəraitindən asılı olması və embrionun inkişaf sürətinin tənzimləmək imkanının olması. Bu isə tırtılın yumurtadan çıxışı ilə inkişafı üçün əlverişli şərtərlə ən münasib şəkildə uyğunlaşmağa imkan verir (Karatay, 2004:96,74).

Qrenanın süni inkubasiyasının 2 üsulu var:

– daimi;
– tədrici.

Qrenanın süni inkubasiyasının daimi üsulunda havanın istiliyi bütün dövr ərzində sabit səviyyədə qalır (Metreveli, 1980:156,108).

Qurdların qrenadan kütləvi çıxması inkubasiyanın düzgün aparılmasından da çox asılıdır. Bütün inkubasiya dövrü otaqda istiliyin və nəmliyin tələb olunan səviyyədə saxlanmasına xüsusi diqqət yetirilməlidir. İnkubasiya əsasən iki üsulla aparılır.

1. Tədriclə qaldırılan istilik şəraitində – bunun üçün qrena inkubasiyaya qoyulduqdan sonra birinci günü istilik 12-14°, sonrakı 2-3 günün hər birində 1° qaldırmaqla 15-16°-yə çatdırılır. Sonrakı gündə tut ağaclarında yarpağın inkişaf və böyümə sürətindən asılı olaraq, hər gün və yaxud hər iki gündən bir istilik 1° qaldırılaraq 22-23°-yə çatdırılır. Qurdların ilk dəstəsi çıxmağa başladıqda istilik 25-26°-yə çatdırılır və bu şəraitdə inkubasiya başa vurulur.

2. Daimi istilik şəraitində – qrena inkubasiyaya qoyulduqda 2-3 gün istilik 13-14° səviyyəsində saxlandıqdan sonra 24-25°-yə qaldırılır və kəşfiyyatçı qurdlar çıxdıqda istilik 26°-yə çatdırılır. Bütün qurdlar çıxıb qurtarana qədər bu səviyyədə saxlanılır.

Hər iki qaydada aparılan inkubasiyanın bütün müddətində nisbi nəmlik 75-80% olmalıdır. İnkubasiyada istilik və nəmliyi təyin etmək üçün psixometrdən istifadə edilir (Lavrentev, 1981:360,21).

Tut ipəkqurdu toxumunun dirildilməsi onun inkubasiya otağında rəflərə düzülməsindən, otaqda lazımi və ciddi hidrotexniki rejimin, şəraitin yaradılmasından, sutkalıq çox ciddi növbətçilik rejiminin təşkil edilməsindən və sonda toxumdan çıxan qurdların (mürcələrin) kümçülərə (tut ipəkqurdu bəsləyənlərə) paylanmasından ibarətdir. Toxumun dirildilməsi tut ipəkqurdu yemləmələrinin əsas mərhələsidir. Burada başlıca diqqət qurdların kütləvi çıxışının yarpağın yetişməsi vaxtına uyğunlaşdırılmasıdır. Az miqdarda qrenanın dirildilməsi üçün inkubatordan istifadə etmək olar. İnkubator tipik olaraq ikiqat divarlı bir şkafdır. İstilik izolyasiyasını artırmaq üçün metal inkubatorlar taxta örtüklə təmin olunur. Şkafın içərisində qrenanı yerləşdirmək üçün rəflər quraşdırılıb, termometr asılıb, havalandırma üçün xüsusi deşiklər açılıb. İnkubatorda qrenanın vəziyyətini izləmək üçün onun qapısında şüşə pəncərə quraşdırılır. Bu pəncərə eyni zamanda inkubatorun daxilinə təbii işığın düşməsini təmin edir. Havalandırma üçün xüsusi cihazlar, istilik üçün isə termostatlardan istifadə edilir. Nəmliyi lazımi səviyyədə saxlamaq üçün heç bir cihaz yoxdur.

Respublikamızda ipəkçiliklə bağlı qəbul olunmuş təlimata görə dirildilmiş qurdlar ən çoxu 35 km ərazidə yaşayan kümçülərə paylanır. 35 km-dən uzaq məsafəyə qurdun paylanması təlimata ziddir və yolverilməzdir. Məhz bunu nəzərə alaraq damazlıq stansiyaları və barama toxum zavodları respublikanın regionlarında, zonalarında nizamlanmalıdır. Odur ki, inkubasiya respublikanın müxtəlif bölgələrində aparılmalıdır. Aparılmış təhlil göstərir ki, ipəkqurdu yumurtasının (qrena) oyadılması prosesi aparılan inkubatoriyanın tikintisi üçün kifayət qədər vəsait tələb olunur və yüksək enerji sərfinə, temperatur, nəmlik və havalandırma sistemlərinə malikdirlər. Eyni zamanda bu inkubatoriyalarda böyük həcmdə qrena oyadıldığından, qurdlar təlimata uyğun olaraq 35 km-dən uzaq məsafəyə paylanması təlimata ziddir və yolverilməzdir. Bu səbəbdən kiçik və orta kəndli-fermer təsərrüfatlarında ipəkqurdu toxumunun (qrenanın) oyadılması təkmilləşdirilərək, inkubasiya qurğusunun istifadəsi üçün iqtisadi cəhətdən əlverişli olardı.

İnkubasiya dövründə yumurtada (qrena) embrion müxtəlif inkişaf mərhələləri keçir. İpəkqurdu yumurtasının əsas inkubasiya şərtləri cədvəl 1-də verilmişdir.

**Cədvəl 1.**
**İnkubasiya rejimi**

| İnkubasiya dövrü | Embrionun inkişaf mərhələsi | Havanın temperaturu ,C | Havanın nəmliyi, % | İşıqlandırma rejimi |
|---|---|---|---|---|
| İnkbasiyaya qədərki dövr | 4 | 17,2 | 79 | Təbii |
| Birinci gün | 5 | 20,0 | 81 | Təbii, tənzimlənməyən |
| İkinci gün | 6 | 22,2 | 78 | |
| Üçüncü gün | 7-18 | 22,2 | 78 | |
| Dördüncü gün | 9 | 24,0 | 79 | |
| Beşinci gün | 10 | 24,5 | 80 | İşıqlı (sutkada 18 saat) |
| Altıncı gün | 11 | 24,5 | 80 | |
| Yeddinci gün | 12 | 24,5 | 80 | Qaranlıq (sutkada 6 saat) |
| Səkkizinci gün | 13 | 25,1 | 80 | |
| Doqquzuncu gün | 14 | 25 | 80 | Qaranlıq (sutka ərzində) |
| Onuncu gün | 15 | 25 | 80 | |
| On birinci gün | Tırtılın dirildilməsi | 25 | 80 | Süni (günəşin çıxmasına 1-2 saat qalmış) |

Bu şərtlərə uyğun müvafiq temperatur, nəmlik, havalandırma və işıqlandırma cihazları seçilib inkubatorda quraşdırılacaqdır. İnkubatorda temperatur, nəmlik, havalandırma və s. bu cihazlar vasitəsilə saxlanacaqdır.

İnkubatorda bu parametrlərə nəzarət etmək üçün, nəzarət-ölçü cihazları quraşdırılmışdır. İnkubasiya zamanı inkubatorda havanın nisbi rütubəti optimal qiymətinin 75÷80 % olmasına xüsusi diqqət yetirilməlidir.

Qrena 90-100 gün qışlama dövrü keçirdikdən sonra, onun daxilindəki rüşeymi müəyyən şəraitdə, yəni inkubatoriyada normal temperatur, rütubət və təmiz hava şəraitində oyadılması üçün toxumlar xüsusi tərəzidə 25 qram çəkilərək qutulara qoyulur. Sonra isə qutular inkubatora yığılaraq inkubasiyaya başlanılır. İnkubasiya dövrü 10-12 gün davam edir (Hüseynov, Musayeva, 2020:24,5-6).

Hər gün qrenadan çıxmış qurdlar yemləndirilməli və həmin gün çəki ilə kümçülərə paylanmalıdır. Bu iş gündüz saat 3-4-ə qədər qurtarmalıdır.

İpəkqurdu yumurtasının oyadılması prosesində tırtılın yumurtadan çıxış həcmi və keyfiyyəti əsasən inkubasiya əməliyyatlarını həyata keçirən texnologiyaların effektivliyindən və bu texnologiyalarda istifadə edilən texniki vasitələrin müasir tələblərə cavab vermə səviyyəsindən asılıdır. Bu tələblərin əsaslarından ən başlıcası vahid məhsulun inkubasiyasına sərf olunan enerjinin səviyyəsinin minimal olmasıdır.

İpəkqurdu yumurtasının oyadılması prosesini yerinə yetirən yeni texniki vasitə "Aqromexanika" ETİ-da layihələndirilib hazırlanmışdır. İpəkqurdu yumurtasının oyadılması prosesini həyata keçirən texniki vasitəyə qoyulan tələbləri nəzərə alaraq, onun iş prinsipini realizə edəcək texniki vasitənin texnoloji struktur sxemi işlənmişdir.

İnkubasiya əsas 3 qovşaqdan ibarətdir:

1. Qızdırıcı qovşaq;
2. Nəmləndirici qovşaq;
3. Havalandırma qovşağı.

## Nəticə

"İpəkqurdu yumurtasının oyadılması qurğusu" ümumi funksional struktur sxemi və prinsipial elektrik sxemi əsasında qurğu layihələndirilərək hazırlanmışdır. Tut ipəkqurdu yumurtasının oyadılması prosesini yerinə yetirən qurğuda tədqiqatların aparılması üçün hazırlıq işləri aparılmış, ölçü cihazları və nəzarət avadanlıqlarının seçimi aparılmışdır.

"Aqromexanika" Elmi-Tədqiqat İnstitutunda işlənmiş "Tut ipəkqurdu yumurtasının oyadılması qurğusu"nun Azərbaycan Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu ilə birgə əməkdaşlıq nəticəsində ilkin sınağı aparılan zaman nəzarət variantları ilə müqayisədə təcrübə variantlarında oyanma 3,0-3,7 % çox olmuşdur ki, bu da çox yüksək göstəricidir.

Qeyd etmək lazımdır ki, istilik, rütubət, havalandırma, işıqlandırma və s. qurğunun avtomatik nizamlanmasının nəticəsində, nəzarət variantı ilə müqayisədə təcrübə variantlarında inkubasiya iki gün tez başa çatmışdır.

## Ədəbiyyat

1. Abbasov, B. (2017). "Azərbaycan Milli İpəkçiliyin inkişaf proqramı". 10 s., 1 s.
2. https://e-qanun.az/framework/37032
3. https://www.agro.gov.az/az/news/20-min-qutu-hibrid-ipekqurdu-senaye-toxumlarinin-kuemcuelere-paylanmasina-baslanilib
4. Abbasov, B.H. (2009). "İpəkçilikdə seleksiyanın nəzəri və praktiki əsasları. Gəncə: İlkin MMC. 277 s., 56 s.
5. Sergeevich, B.V. (2005). Povishenie effektivnosti shelkovodstva na baze novikh texnologiy s ispolzovaniem razrabotannikh texnicheskikh sredstv. 266 s., 109 s.
6. Seyidov, A.K., Abbasov, B.H. (2012). İpəkçiliyin əsasları, dərslik. Bakı: Müəllim nəşriyyatı, 86 s., 19 s.
7. Zlotin, A.Z. (1984). Zanimatelnoe shelkovodstvo. 72 s., 24 s.
8. Zlotin, A.Z. (1986). Priusadebnoe shelkovodstvo. 32 s, 12 s.
9. Karatay, V.N. (2004). Promishlennoe razvedenie shelkopryadov. 96 s.,74 s.
10. Metreveli, V.I. (1980). Tutovodstvo i shelkovodstvo. 156 s., 108 s.
11. Lavrentev, S.D. (1981). Uchebnaya kniga shelkovodstva. Moskva, izd. "Kolos", 360 s., 21 s.
12. Hüseynova, R.R., Musayeva, S.R. (2020). Tut ipəkqurdunun bəslənməsi qaydaları. 24 s., s.5-6.

**Rəyçi: t.f.d. İlqar Hacıyev**

Göndərildi: 21.08.2022 Qəbul edildi: 01.10.2022

# İÇİNDƏKİLƏR

## TİBB VƏ ƏCZAÇILIQ ELMLƏRİ
## MEDICINE AND PHARAMACEUTICAL SCIENCES



## BİOLOGİYA ELMLƏRİ VƏ AQRAR ELMLƏR
## BIOLOGICAL AND AGRARIAN SCIENCES

